# DİNİN DOĞRU ANLAŞILMASI ÜÇÜN
# DÖRD QAYDA

Şeyx Mücəddid İmam Muhamməd ət-Təmimi

Hikmət Toxumu

Uca ərşin Rəbbi olan Allahdan səni dünya və axirətdə Özünə dost və harada olmağından asılı olmayaraq mübarək etməsini arzu edirəm.

Allahdan, sənə bir xeyir verildikdə şükür, imtahan edildikdə səbr, günah etdikdə isə istiğfar edən kəslərdən etməsini istəyirəm. Çünki bu üç şey səadətə qovuşmağın (xoşbəxtliyin) əlamətidir.

Allah səni itaətinə yönəltsin! Bil ki, İbrahim *əleyhissəlamın* milləti olan həniflik, ibadətdə Allahı təkləmək və dini Ona xas etməkdir. Allah *Azzə və Cəllə* bütün insanlara bunu əmr etmiş və onları məhz bunun üçün yaratmışdır. Allah *Azzə və Cəllə* belə buyurur:

**"Mən cinləri və insanları ancaq Mənə ibadət etmək üçün yaratdım."** *(Zariyat 51/56)*

Əgər Allahın, səni yalnız Ona ibadət etmək üçün yaratdığını öyrənmiş oldunsa, bil ki, namaz dəstəmazla, ibadət də ancaq tövhidlə birlikdə ibadət olaraq adlandırılır. Dəstəmaz onu pozan amillərdən biri ilə pozulduğu kimi, tövhid də şirk ilə pozulur.

Şirkin ibadətə qarışdıqda onu fəsada uğratdığını, əməlləri boşa çıxardığını və sahibini əbədi atəşə saldığını öyrəndikdən sonra bilməlisən ki, sənin öyrənməli olduğun ən vacib şey şirkdir. Bunu öyrəndikdən sonra ümid edilir ki, Allah *Azzə və Cəllə* səni şirkdən uzaqlaşdırar. Allah *Azzə və Cəllə* şirk haqqında belə buyurur:

**"Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa (günahları) isə dilədiyi kimsəyə bağışlayar."** *(Nisa 4/48)*

Bu isə ancaq Allahın kitabında bildirdiyi dörd qaydanı öyrənməklə mümkündür:



## Birinci qayda

Bilməlisən ki, Rəsulullah *sallallahu aleyhi və səlləmlə* vuruşan kafirlər Allahın yaradan, ruzi verən və kainatın işlərini tənzimləyən olduğunu qəbul edirdilər. Lakin bu, onların İslam dininə daxil olmasını təmin etmədi. Bunun dəlili Allah *Azzə və Cəllənin* bu sözüdür:

**"De: "Sizə göydən və yerdən ruzi verən kimdir? Qulaqlara və gözlərə hakim olan kimdir? Ölüdən diri çıxaran, diridən də ölü çıxaran kimdir? İşləri yoluna qoyan kimdir?" Onlar deyəcəklər: "Allah!" De: "Bəs (belə olduğu halda) (Allahdan) qorxmursunuz?""** *(Yunus 10/31)*

## İkinci qayda

Müşriklər belə deyirdilər: "Bizi Allaha yaxınlaşdırsınlar və bizə Allah qatında şəfaət etsinlər deyə onlara (bütlərə) dua edir və yönəlirik." Onların bütlərə dua edib yönəlmələrinin dəlili bu ayədir:

"Allahı qoyub başqalarını özlərinə dost tutanlar:

**"Biz, onlara ancaq bizi Allaha daha çox yaxınlaşdırsınlar deyə ibadət edirik"– (deyirlər.) Əlbəttə ki, Allah ziddiyyətə düşdükləri şeylər barəsində onların arasında Öz hökmünü verəcəkdir. Şübhəsiz ki, Allah yalançı və kafirləri doğru yola yönəltməz."** *(Zumər 39/3)*

Müşriklərin Allah qatında onlara şəfaət etsinlər deyə bütlərə ibadət etmələrinin dəlili Allahın bu sözüdür:

**"Onlar Allahı qoyub özlərinə nə bir zərər, nə də bir fayda verə bilənlərə ibadət edir və: "Onlar Allahın dərgahında bizim şəfaətçilərimizdir!"– deyirlər."** *(Yunus 10/18)*

Şəfaət, mənfi və müsbət şəfaət olmaqla iki yerə ayrılır:

**Mənfi şəfaət:** Allahdan başqa heç kəsin gücü çatmadığı işlərdə Allahdan yox, qeyrisindən bir şey tələb etməkdir. Bunun



dəlili Allah *Azzə və Cəllənin* bu sözüdür:

**"Ey iman gətirənlər! Alış-verişin, dostluğun və şəfaətin olmayacağı gün gəlməmişdən öncə sizə verdiyimiz ruzidən (Allah yolunda) xərcləyin! Kafirlər isə zalımdırlar."** *(Bəqərə 2/254)*

**Müsbət şəfaət:** bu, Allahdan tələb edilən şəfaətdir. Şəfaət edəcək olan, şəfaət etməyə layiq olandır. Şəfaət ediləcək olan da Allahın, söz və əməlindən razı olduğu, izn verdiyi kəsdir. Allah *Azzə və Cəllə* belə buyurur:

**"Onun izni olmadan Onun yanında kim şəfaət edə bilər?"** *(Bəqərə 2/255)*

## Üçüncü qayda

Peyğəmbər *sallallahu aleyhi va səlləm* canlı və cansız varlıqlara ibadət edən insanların arasından çıxdı. Onlardan bir qismi mələklərə, bir qismi ağac və daşlara, bir qismi də günəş və aya ibadət edirdi. Rəsulullah *sallallahu aleyhi və səlləm* onların arasında heç bir ayrıseçkilik etmədən hamısı ilə savaşdı.

Bunun dəlili Allahın bu sözüdür:

**"Fitnə aradan qalxana qədər və din tamamilə yalnız Allaha həsr edilənədək onlarla vuruşun!"** *(Ənfal 8/39)*

Müşriklərin günəşə və aya ibadət etmələrinin dəlili Allahın bu sözüdür:

**"Gecə və gündüz, günəş və ay Onun dəlillərindəndir. Əgər siz Ona ibadət edirsinizsə, onda günəşə və aya səcdə etməyin, onları yaradan Allaha səcdə edin."** *(Fussilət 41/37)*

Mələklərə ibadət etmələrinin dəlili isə Allah *Azzə və Cəllənin* bu sözüdür:

**"O sizə mələkləri və peyğəmbərləri özünüzə rəblər qəbul etməyi buyurmaz."** *(Ali-İmran 3/80)*

Allah *Azzə və Cəllə* belə buyurur:



**"Allah deyəcəkdir: "Ey Məryəm oğlu İsa! Sənmi insanlara: "Allahı qoyub məni və anamı iki tanrı qəbul edin!"– demişdin?" İsa deyəcək: "Sən pak və müqəddəssən! Haqqım olmayan bir şeyi demək mənə yaraşmaz. Əgər bunu demiş olsaydım, əlbəttə, Sən onu bilərdin. Sən mənim qəlbimdə olanları bilirsən, mən isə Sənin Özündə olanları bilmirəm. Şübhəsiz ki, qeybləri bilən Sənsən! Mən onlara ancaq Sənin mənə əmr etdiyini: "Mənim də Rəbbim, sizin də Rəbbiniz olan Allaha ibadət edin!"– demişəm. Nə qədər ki, onların arasında idim, mən onlara şahid idim. Sən məni (onların arasından) götürdükdən sonra isə onlara nəzarət edən Özün oldun. Sən hər şeyə Şahidsən."** *(Maidə 5/116-117)*

Salehlərə ibadət etmələrinin dəlili Allah *Azzə və Cəllənin* bu sözüdür:

**"Onların yalvardıqları varlıqların özləri də Rəbbinə – hansı daha yaxın olacaq deyə vəsilə axtarırlar, Onun rəhmətini umurlar, əzabından qorxurlar. Həqiqətən, Rəbbinin əzabından qorunmaq gərəkdir."** *(İsra 17/57)*

Daşlara ibadət etmələrinin dəlili Allah *Azzə və Cəllənin* bu sözüdür:

**"Siz (tapındığınız) Lat və Uzzanı gördünüzmü? Həmçinin üçüncü olan Mənatı da?"** *(Nəcm 53/19-20)*

Ağaclara ibadət etmələrinin dəlili isə bu hədisdir:

Əbu Vaqid əl-Leysi *(Allah ondan razı olsun)* rəvayət edir ki, Peyğəmbər *sallallahu aleyhi və səlləmlə* birlikdə Məkkədən Huneynə tərəf yola çıxmışdıq. Biz o vaxtlar küfrdən yenicə çıxıb, təzəcə müsəlman olmuş kimsələr idik.

Müşriklərin silahlarını üstündən asdıqları böyük bir sidr ağacı vardı. Onlar onun ətrafında yığışaraq öz adət-ənənələrini yerinə yetirir və həmin ağacı **"Zətu Ənvat"**- deyə çağırırdılar. Biz də



böyük bir sidr ağacının yanından keçdikdə: "Ey Allahın Peyğəmbəri! Bizə də onların "Zətu Ənvat"ı kimi "Zətu Ənvat" düzəlt"- dedik. Peyğəmbər *sallallahu aleyhi və səlləm* belə buyurdu: ***"Allahu Əkbər! Sizin dediyiniz bu söz İsrail oğullarının Musaya dediyi: "*...Onların ilahları kimi bizim üçün də bir ilah düzəlt!" - söz kimidir.** *(Əraf 7/138)*. ***Həqiqətən, siz əvvəlkilərin yolu ilə gedəcəksiniz."*** *(Tirmizi)*

## Dördüncü qayda

Şübhəsiz ki, bugünkü müşriklərin şirki, əvvəlki müşriklərin şirkindən daha şiddətlidir. Çünki əvvəlki müşriklər Allaha şirk qoşur amma çətinliyə düşdükdə yalnız Allaha yönəlirdilər. Bugünkü müşriklərin şirki isə daimidir. Həm rahatlıqda, həm də çətinlikdə Allaha şərik qoşurlar. Bunun dəlili Allah *Azzə və Cəllənin* bu sözüdür:

**"Onlar gəmiyə mindikləri zaman, dini yalnız Allaha məxsus edərək, Ona yalvarırlar. (Allah) onları xilas edib quruya çıxaran kimi, yenə də (Ona) şərik qoşurlar."** *(Ənkəbut 29/65)*